KƏRİM AĞA FATEH

# ŞƏKİ XANLARININ MÜXTƏSƏR TARİXİ

HACI SEYİD ƏBDÜLHƏMİD

# ŞƏKİ XANLARINI VƏ ONLARIN NƏSİLLƏRİ

"AZƏRBAYCAN ENSİKLOPEDİYASI"
NƏŞRİYYAT-POLİQRAFİYA BİRLİYİ
BAKI - 1993

**Buraxılışına məsul:** **Rza Əsgəroğlu.**
**Korrektor:** **N.Hüseynova**

**KƏRİM AĞA FATEH.** "Şəki xanlarının müxtəsər tarixi".

**HACI SEYİD ƏBDÜLHƏMİD.** "Şəki xanları və onların nəsilləri".

2-ci, təkrar nəşri.
"Azərbaycan Ensiklopediyası" NPB
B. 1993, 32 səh.

Şəki xanlığının tarixindən bəhs edən bu kitabçada verilmiş əsərlər Azərbaycanın XVIII-XIX əsrlər tarixinə dair mühüm mənbələrdən sayılır. Vaxtilə cəmi üç min nüsxə ilə çap olunmuş bu kitabçanın təkrar nəşri geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.

**0503000000-77** **27-91**
**M – 657 (07)- 93**

**İSBN5 – 89600 – 007 – 4**

# ÖN SÖZ

Oxuculara təqdim etdiyimiz "Şəki xanlarının müxtəsər tarixi", "Şəki xanları və onların nəsilləri" adlı əsərlər Azərbaycanın XVIII-XIX əsrlər tarixinə aid mühüm mənbələrdən hesab olunur.

"Şəki xanlarının müxtəsər tarixi" elm aləminə hələ 1858-ci ildən məlumdur. Həmin ildə akad. B.Dorn Azərbaycan dilində yazılmış bu əsərin əslini "Əl-İntixabat-ül-bəhiyyə" adlı külliyatda topladığı tarixi əsərlər sırasında Peterburqda nəşr etdirmişdir. Altmış altı il keçdikdən sonra, həmin əsərin əsli və ruscaya tərcüməsi "Azərbaycanı Tədqiq və Tətəbbə cəmiyyəti" tərəfindən nəşr etdirilmişdir. Lakin təəssüflə qeyd etmək lazımdır ki, hər iki nəşrdə əsərin həqiqi müəllifini müəyyən etməkdə bağışlanılmaz səhvə yol verilmiş və əsəri başqa bir şəxsin, bu əsərlə heç bir əlaqəsi olmayan adamın adı ilə nəşr etdirmişlər.

B.Dorn yuxarıda göstərdiyimiz külliyatın 13-cü səhifəsində əsərin müəllifi haqqında belə deyir: "1858-ci ildə bu əsərin müəllifi haqqında Xanıkov mənə belə yazmışdır: "Kiçik Şəki tarixinin müəllifi mənim dostum, nəslənbənəsl Şəki qazısı olan Hacı Əbdüssəlim[1] əfəndinin oğlu Hacı Əbdüllətif əfəndidən başqa kimsə ola bilməz. İndi bu adam altmış yaşındadır. O, ərəbcəni gözəl bilir, fars şerilə də xeyli məşğul olmuşdur. 1845 və 1846-cı illərdə o, İstanbula, Misirə və Məkkəyə getmiş, oradan Suriya, Bağdad, Kərbəla, Həmədan, Tehran, Təbriz və Şuşa təriqilə vətəninə qayıtmışdır. 1848-ci ildə o, Dağıstan səyahətinə çıxmış və həmin vaxtdan Nuxada öz ailəsilə birlikdə rahat yaşamaqdadır. Bu xoş sima qoca, türkcə və farsca gözəl danışır. Mən 1848 və 1849-cu illərdə, iki dəfə ona qonaq olmuşam"[2]

Buradan aydındır ki, B.Dornu bu səhvə sövq edən məruf şərqşünas və xüsusilə Qafqaz mütəxəssisi olan N.Xanıkovun belə bir qətiyyətlə verdiyi məlumat idi. Bizcə, əsərin əlyazması B.Dorn və N.Xanıkov tərəfindən dərindən tədqiq edilməmiş və bu da belə bir səhvin meydana çıxmasına səbəb olmuşdur. Bu şərqşünasların ardınca kor-koranə gedən prof. N. İ. Aşmarin və əsərin 1926-cı il nəşri üçün tərcümə edən A. Dadaşov[3] eyni səhvi təkrar etmişlər. N. İ. Aşmarin kitabın müqəddiməsi əvəzinə yazdığı 24 sətirlik məqalədə N. Xanıkovun B. Dorna yazdığı məlumatdan başqa əsərə heç bir şey əlavə edə bilməmişdir. Bu isə əsərin N. İ. Aşmarin tərəfindən nəinki tədqiq edilmədiyinə, bəlkə sadəcə olaraq oxunmadığına belə dəlalət edir.

---

[1] Bax: S.Mümtaz. "Tənqid və mülahizələr". "Maarif işçisi" jurnalı N 2-3 (43-44), Bakı,1929.

[2] Əbdüllətif əfəndi haqqında daha müfəssəl məlumat almaq üçün «Колониаьная политика Российкого царизма в Азербайджана», II hissə, M.-L.,SSRİ EA Nəşriyyatı, 1937 , səh. 25, 26, 28, 29, 32, 344 səhifələrə və S.Mümtazın yuxarıda göstərilən məqaləsinə bax.

[3] Əbdüllətif Əfəndi. "Şəki xanlarının müxtəsər tarixi" Azərbaycanı Tədqiq və Tətəbbə cəmiyyiti. Bakı, 1926.

Bu səhv ilk dəfə S.Mümtazın "Maarif işçisi" jurnalının 1929-cu il 2 və 3-cü nömrələrində dərc etdirdiyi "Tənqid və mülahizələr" adlı məqaləsində aşkara çıxarılmışdır. S.Mümtaz qənaətləndirici dəlillərlə sübut etmişdir ki, bu kiçik , lakin olduqca qiymətli əsərin müəllifi Hacı Çələbi nəslindən olub, Şəkinin son xanı - Fətəli xanın oğlu, Fateh təxəllüsü ilə şer yazan Kərim ağadır.

S.Mümtaz həmin əsəri tədqiq və başqa məxəzlərə müraciət edərək belə bir nəticəyə gəlir: "Fətəli xan, məşhur Hacı Çələbi xanın nəticəsi, Həsən ağanın nəvəsi və Məhəmmədhüseyn xan Müştaq təxəllüslünün oğludur. Məhəmmədhüseyn xanın üç oğlu var idi ki, onlar da Məhəmmədhəsən xan, Fətəli xan və Səlim xandan ibarət idi. Məhəmmədhəsən xan ilə Səlim xanın hər birinin üç oğlu olduğu halda, Fətəli xanın yalnız bir oğlu var idi ki, o da türki və farsi şerləri ilə məşhur olan Kərim ağa Fatehdir".

Bu sözlərin həqiqət olduğunu müəllifin özü tərəfindən tərtib olunan və əsərin sonuna əlavə edilən sülalə cədvəli və əsərdə nəzərə çarpan ayrı-ayrı cümlələr təsdiq edir. Doğrudur, müəllif Şərq adətinin əksinə olaraq, istər əsərin əvvəlində, istərsə də sonunda öz adını çəkmir, lakin o, S.Mümtazın dediyi kimi, "əsərin içində bu nöqtəni anlatmaq üçün, bəzi yerdə lazımi dərəcədə məlumat vermişdir". Məsələn, biz 19-cu səhifədə belə cümlələrə rast gəlirik. "Mənim atam Fətəli xan, Məhəmmədhəsən xanın qardaşıdır. Onun anası Ərəş sultanının qızıdır. Ərəş sultanı Məlik Əlinin oğlanları o vaxtda Ərəşdə böyük , sikkəli və güclü bəylər imiş ki, Fətəli xanın anasının qardaşlarıdır. Məhəmmədhəsən xan Fətəli xanın qohumları böyük və çox olmaq və özü də Hüseyn xanın istəkli oğlu olmaq səbəbindən ehtiyat edir ki, bəlkə xarab (xəyanət) eləyə, tutub Fətəli xanın gözlərini çıxardıb, özü də evində dustaq edər".

21-ci səhifədə yazılmışdır: "Şəki əhli, böyük-kiçik yığılıb mənim atam Fətəli xanın üstünə cəm olub, andlar içib, bərk ittifaq edib, tarixi islamiyyə min iki yüz on doqquzla olanda xan edərlər. İki üç ay xanlıq edər".

Yenə orada: "Mustafa xan görər ki, fikri əmələ gətirə bilməz və Fətəli xanın yanını adam göndərər və dostluq edər ki, oğlunuda da göndərsin, bir neçə vaxt yanında qalsın. Məndə kiçik idim. Atam məni Şirvana göndərdi."

Nəhayət, müəllif axırda özü haqqında belə yazır: "Səlim xan bir az dava edər, bacarmaz, çıxıb Qızılbaş tərəfinə qaçar. Nebolsin yanaral bu vilayətin ixtiyarın yenə Fətəli xana verər. Amma Xoylu Cəfərqulu xan Şəki vilayətini padşahi-aləmpənahdan istəyib, padşah da ona veribdirmiş. Sonra tarixi islamiyyə min iki yüz iyirmi birdə olanda Cəfərqulu xan padşahın əmri ilə Şəki vilayətində xan oldu. Mən də Cəfərqulu əyyamı Şəkiyə gəldim".

Yuxarıda göstərilən dəlillər əsərin müəllifinin Kərim ağa Şəkixanov Fateh olduğunu və yüz ildən bəri əsərin müəllifi sayılan Hacı Əbdüllətif əfəndinin əsərlə heç bir əlaqəsi olmadığını sübut edir.[4]

Əsərin əhəmiyyətinə gəldikdə, yuxarıda qeyd etdiyimiz kimi, Kərim ağa Fatehin yazdığı bu tarixcə XIX əsrdə Azərbaycanın ayrı-ayrı rayonları haqqında yazılmış həcm etibarilə kiçik, lakin olduqca qiymətli tarixi oçerklərdən biridir.

Bu əsər Şəkinin XVIII-XIX əsrlər siyasi tarixinə aid ilk mənbələrdən biridir. Nuxanın qədim dövrünə aid olan hissə rəvayət və əfsanəyə əsaslandığı halda, əsərin digər hissələrində XVIII əsrin ikinci yarısı və XIX əsrin birinci rübündə Şəkidə baş verən tarixi hadisələr haqqında çox maraqlı və Şəki xanlığı tarixini tədqiq edənlər üçün olduqca qiymətli məlumatlar vardır.

Şəkinin, Hacı Çələbi nəslindən son xanının oglu olan Kərim ağa bütün siyasi hadisələrin şahidi olaraq, sarayda gedən mübarizə və fitnəkarlıqların iç üzünü bilirdi. Bu hadisələrdə həyati mənafei və onlarla yaxından əlaqədar olduğuna baxmayaraq, müəllif saray devrilişlərini, xanlıq üstə gedən qanlı mübarizələri, hətta atasının öz qardaşı tərəfindən kor edildiyini tarixçiyə xas olan soyuqqanlıqla və qərəzsiz bir şəkildə təsvir etmişdir.

Bu əsərin tarixi əhəmiyyətindən başqa, filoloji əhəmiyyəti də vardır.

"Şəki xanları və onların nəsilləri" əsəri ilk dəfə 1930-cu ildə Azərbaycan Elmi Tədqiqat İnstitunun tarix-etnoqrafiya şöbəsi tərəfindən nəşr edilmişdir. Həmin nəşrin əsasını məşhur məxəzşünasımız S.Mümtazın tapdığı əlyazması təşkil edirdi. S.Mümtaz kitabın müqəddiməsində əlyazması və onun müəllifi haqqında belə məlumat vermişdir:

"1909-cu ildə Şəkidə, şəkili Hacı Yəqub əfəndi Əfəndizadənin kitabxanasında əldə etdiyim bu tarixcə gələcəkdə yazılacaq Azərbaycan tarixinin Şəki qismi üçün mühüm bir vəsiqə və dəyərli bir material ola biləcəkdir. Müsənnifi haqqında isə istər Hacı Yəqub əfəndinin, istər Calutlu Molla Abbasın verdikləri məlumat bir-birlərinə uyğun və mütabiqdir. Onlarca bu tarixcənin müsənnifi Seyid Hacı Əbdülhəmid əfəndidir ki, hicri 1210-cu (1795 – 96) ildə Şəki şəhərində anadan olaraq, İmam Hacı Məhəmməd əfəndi ilə müdərris Hacı Abdulla əfəndilərdən də zamanının elmini təhsil etmişdir.

Təhsilini bitirdikdən bir az sonra bir ara səyahətə çıxmış, Məkkə, Mədinə, Misir, Qahirə, İsgəndəriyyə, Şam, İstambul, Trabzon şəhərlərini gəzərək, Tiflisə gəlmişdir.

Nəhayət, bir müddət Qazax, Gəncə şəhərlərində yaşadığı kimi, iki il də Şamaxı şəhərində sakin olmuşdur. Seyidlərin nəcabətləri təhqiq olunan komisyonunda da birinci calis təyin olunmaqla bərabər qırx ildən də artıq şəriət

---

[4] Bax: Сегаль. «Елизаветпольская губерния». Тифлис, 1902, səh. 11; B. II. Левиагов. «Очерки из истории Азербайджана в XYIII веке», Bakı, Azərbaycan SSR EA Nəşriyyatı, 1948. Səh 7; A.B.Şükürzade. Об авторстве «Истории Шекинских ханов» Bakı Azərbaycan SSr EA-nın "Məruzələri", 1951. N 1, səh. 43-45.

məhkəməsində yenə birinci calislik vəzifəsini ifa ilə o məhkəməni idarə etmişdir. Bu xidmətlərinə çar hökümətindən mükafat olaraq üç qızıl saat, bir qızıl ənfiyədən, bir cəvahirli qızıl üzük və ildə də iki yüz manat məvacib ilə təltif edilmişdir. Seyid Hacı Əbdülhəmid əfəndinin tərcümeyi-halı ilə yazdığı tarixçəsi də bir-birləri ilə rabitəli və əlaqədardır.

Müsənnif adi bir əfəndi və məruf bir ruhani olmaqdan həzz almamış və ona görə də səyahətləri ilə özünü narahat edərək, istirahətini də pozmağa cürət etmiş və mövzui-bəhsimiz olan bu tarixcəni də yaman-yaxşı yaza bilmişdir”...

Şübhəsiz ki, nəşr etdiyimiz bu əsərlər bir sıra başqa mənbələrlə birlikdə Azərbaycan tarixini daha dərindən tədqiq etməyə kömək edəcəkdir.

*F. BABAYEV*

Kərim ağa Fatehin əsərini 1997-ci ildə Məmməd Adilov “Şəki xanlarının əslü nəcabəti haqqında” şərti adı ilə “Tarix” qəzetində (N 18) çap etdirmişdir. Mətnlər arasında müəyyən nüsxə və oxu fərqləri vardır.

*Redaksiyadan*

# KƏRİM AĞA FATEH
# ŞƏKİ XANLARININ MÜXTƏSƏR TARİXİ

Noxuda bir keşiş varmış, amma nə tarixdə olduğu məlum deyildir, adına Qara keşiş deyərlərmiş. Noxuda böyük imiş. Və bir keşiş də Kiş kəndində böyük imiş. Qara keşiş Kişdəki keşişin qızını oğluna istər ki ala. Kişdəki keşiş deyər ki, mənim qızım ağ su ilə pərvəriş tapıbdır, qara su olan yerə qızımı verməriəm. Sonra Qara keşiş deyər ki, Kiş çayından bir arx mən də evimin yanına gətirərəm. Kişdəki keşiş deyər ki, suyu gətir, sonra qızımı oğluna verim. Qara keşiş bu sudan bir arx gətirər. Sonra (Kişdəki keşiş) qızını bunun oğluna verər. Və Qara keşişin oğlunun adı Candardır. Candar bir neçə vaxtdan sonra müsəlman olub, adına Əlican deyibdirlər və Əlicanın oğlu Qutul xandır. Qutul xanı İran padşahının biri Şəkidə xan edibdir. Qutul xanın oğlunun adı Şəki xandır. Və Şəki xanın oğlunun adı Həsən Sultandır.

Amma Həsən Sultanın qəziyyəsini "Aləm-ara" adlı bir tarix kitabı var, o kitabda belə yazıbdır ki, Həsən Sultan (ali) - Səfəviyyə şahı Şah İsmayıla qulluq edərdi. Gürcü valisinin gücü və qüdrəti çox idi. Amma şaha qulluq eləmək səbəbi ilə Həsən Sultana gücü çatmazdı. Şah İsmayıl ölən ildə Gürcüstan valisi Levond xan qoşun götürüb gəlib və Həsən Sultan da qoşun ilə onun qabağına gedib, dava elədilər. Davada Həsən Sultan öldü. Sonra Şəki vilayətinin böyükləri Həsən Sultanın oğlu Dərviş Məhəmməd xanı özlərinə hakim elədilər. Və Şah İsmayıl öləndən sonra oğlu Şah Təhmasib İranda şah oldu.

Dərviş Məhəmməd xan atası kimi şaha qulluq eləmədi. Şirvan vilayətinə şahın qoşunu gəlib dava edəndə, Dərviş Məhəmməd xan da qoşun götürüb gedib Şirvanda Qızılbaş qoşununa şəbxun edibdirmiş. Bu qəziyyəni də Şah Təhmasibə Şirvandakı qoşun böyükləri məlum elədi. Şah Təhmasib, tarixi-islamiyyə doqquz yüz əlli səkkizdə olanda, qoşun ilə gedib, Ərəş mahalına düşdü. Şah Ərəşə gələndə bu ətrafda olan hakimlər ehtiyat elədilər. Levond xan valiyi-Gürcüstan Ərəşdə şahın qulluğuna gəlib,itaət elədi və şah ona xələt verdi və nəvaziş elədi. Şah, Dərviş Məhəmməd xana fərman göndərdi ki, gəl sən də qulluq elə; özünü xarab eləmə, padşahın sənə şəfəqqəti çox olar. Dərviş Məhəmməd xan və Şəkinin böyükləri yerlərinin möhkəmliyinə məğrur olub, qəbul eləmədilər. Şəki vilayətinin sərkərdələri, bəzisi Kiş qalasını bərkidib onda durdular və Dərviş Məhəmməd xan özü bir para böyüklərlə Gələsən-görəsən qalasına getdilər.

Gələsən-görəsən qalası çox hündür və bərk olmasına görə onu heç kimsə ala bilməmişdi. Və bir para adamlarda Əbruz (Elbrus) dağı ki, Qafqazdır, onun ətəklərində sığnaq elədilər. Şah Təhmasib bu işdən çox acıqlanıb, qızılbaş xanlarının bir parasın Kiş qalasına almağa müqərrər buyurdu. Və bir para xanları

Levond xan bilə Gələsən-görəsən qalasının üstünə göndərdi; və bir para xanları Əbruz ətəyində olan sığnaq üstünə göndərdi.

Kiş qalasına gedən xanlar qalaya top və tüfəng urdular. Qala əhli gördülər (ki) qala xarab olur. Qalanın yaharın (açarın) özlərilə götürüb, padşahın hüzuruna gəldilər. Padşahın bunlara şəfəqqəti oldu və xələt verdi. Sonra padşah buyurdu Kiş qalasın söküb, xarab elədilər. Və padşah özü də qoşun ilə sığnaq tərəfinə hərəkət elədi.

Sığnaq əhli padşahın gəlməyin və Kiş qalasının xarab olmağın görüb, dəstə-dəstə, fovc-fovc padşahın hüzuruna gəlib, icz izhar elədilər.

Dərviş Məhəmməd xan, bu adamların getməyin və özləri yalquz qalmağın görüb, peşiman olub bir gecə 400 adam götürüb, Gələsən-görəsəndən çıxdı ki, qaça gedə. Bir para xanlar ki, Levond ilə o həvalidə durmuşdular Dərviş Məhəmməd xanın getməyin bilib, qoşun əhli yolların tutubdurlar. Bir az yol getməmiş bunlara çatıb, dava elədilər. Dərviş Məhəmməd xanın çox adamları ölüb, Dərviş Məhəmməd xan özü şamlu Çərəndab Soltanın nökəri Kosa Pirqulu adlı ilə bərabər gəlib, dava elədilər. Kosa Pirqulu buna artıq gəlib başın kəsib, padşahın hüzuruna gətirdi. Padşah buna çox pul və xələt verdi və Şəki vilayətini zəbt elədi. Bu yerəcən "Aləm-ara" kitabinda yazıbdır.

Dərviş Məhəmməd xanın oğlu Baqi bəy uşaq qalıbdır. Dərviş Məhəmməd xan öləndən sonra Şəki vilayətindən bir Hüseyncan adlı bir rəşid kimsə şaha qulluq edərmiş. Şah Təhmasib onu Şəki mahalında, fərman verib, məlik edib. Məlik Hüseyncan deyibdirlər və dəxi (daha) Şəki vilayətində xan qayırmayıb. Və Məlik Hüseyncanın oğlu – Məlik Ziyaüddin Əhməd yüzbaşı, onun oğlu – Məlik Qasım yüzbaşı, onun oğlu – Məlik Əhməd xandır. Bir neçə arxa Şəki mahalında bular məliklik edibdirlər. Bulara Əskiməliklü deyərlər.

Məlik Əhməd xan öləndən sonra uşaqları qalıb, Səfəviyyə padşahının biri adam göndəribdir ki, Şəki mahalının neçə əşya (sənəlik) şahın dəxlin onun övladından alın. Mühəssil gəlib, bunların özlərin və övrətlərin döyüb, tamam mallarin alıb və məliklik adın kəsib, bir özgə nəsildən bir məlik Şəki mahalına fərman verib, məlik edibdir. Onun adı Məlik Hüseyn Saqidir. Bular da iki-üç arxa məliklik edibdir. Biri Məlik Əlmərdən və biri də Məlik Nəcəfdir ki, bular da o nəsildəndir. Axırki Məlik Nəcəfdir, padşah (Nadir şah?) əyyamı malikdir. Və Baqi bəy ki Dərviş Məhəmməd xanın oğlu idi, onda bəylik olmayıb, onun oğlu Əlican, onun oğlu Əsgər və Əsgərin oğlu Alahverdi, onun oğlu Əlican və Əlicanın iki oğlu olub: biri Qurban və biri Əhməd. Qurbanın oğlu Hacı Çələbi və Əhmədin oğlu Hacı Şeyxəli. Hacı Çələbinin Məlik Nəcəf məlik olanda, Şəkidə el arasında abru-dövləti varmış. Hacı Şeyx Qulunun (Şeyx Əlinin) da dövləti varmış. Amma Hacı Çələbinin sikkəsi və rəşadəti ondan artıq imiş.

Məlik Nəcəf padşahdan, özündən qulluq olanda sünni əhlinə çox həvalə edərmiş və sünni əhlini çox incidərmiş. Sünni əhli bunun işindən təngə gəlib Nadir şaha ərz eylədilər ki, məlik qızılbaş olmaq səbəbi ilə bizi çox incidir. Qulluq dərgar

olanda qızılbaş əhlindən bizə çox artıq qoyur, bizləri xarab eləyibdir. Padşahın rəiyyəti varıq. Allah xatirinə bizə bir çarə elə. Padşah onlara buyurubdur ki, siz sünni əhlindən bir yaxşı adam qəbul eləyin, qayırın sünni əhlindən vəkil, mənim yanıma gəlsin. Ona fərman verib, mən də vəkil elərəm ki, məlik onsuz bir iş duta bilməsin. Sünni əhli şahın əmrinə görə, məşvərət edərlər ki, Hacı Çələbinin ata-babalarında böyüklük var və özü də rəşid və iş bilən adamdır. Bunu vəkil eləyək.

O vaxt Hacı Çələbi də (hələ) həccə getməmişmiş, adına Çələbi deyərlərmiş. Xalq bunu vəkil edib, padşahın hüzuruna göndərərlər. Şah buna fərman verib, Şəki mahalına vəkil edər ki, Məlik Nəcəf bunsuz rəiyyətə qulluq həvalə eləməsin. Fərman alıb Şəkiyə gəlir, adına vəkil Çələbi deyibdirlər. Məlik Nəcəfi qoymazmış ki, sünni əhlin bihəq yerə incitsin. Məlik Nəcəf bundan ürəyi kinli, ədavətli olub, bəhanə axtarırdı ki, bunu şahın yanında sahibi-təqsir eləsin. Neçə vaxt bundan keçəndən sonra məlik şahın yanına gedər. Şah da İran-Xarabda imiş. Şaha ərz elər ki, Çələbi məni qoymur ki, şahın qulluğun rəiyyətə buyuram. Şahın qulluğunu tutmurlar. Nə özü qulaq asır, nə xalqı qoyur. Şah qəzəbnak olub, Çələbini istər, Çələbi şahın qulluğuna gedər. Şaha bunun gəlməyi məlum olur. Hüzura istər. Məlik də hüzurda varmış. Şah Çələbiyə acıqlanıb ki, mənim qulluğumu nə üçün qoymursan əmələ gələ. Bunu öldürün! Çələbinin boğazına kəndir salırlar. Bu halda, kəndir boğazında, ərz eləyər ki, başına dönüm, mənim təqsirim nədir, bihəq yerə məni öldürürsən? Şah buyurur ki, məlik deyir: Çələbi qoymur şahın qulluğu əmələ gələ. Ərz eylər ki, sənə fəda olum, məsələn şahdan bir qulluq gəlsə məlik dört-beş qulluq da onun üstünə qoyub rəiyyətə həvalə eylər. Mən deyirəm ki, şah məni vəkil edibdir. Razı olmanam ki, şahın rəiyyəti (ni) əbəs yerə xarab eləyəsən. Məlik bu səbəbdən xilaf yerə ərz eylər. Rəiyyət padşahın ixtiyarındadır.

Məlik bu sözdən çox qorxub, şah məlikə çox qəzəbnak olub, Çələbini mürəxxəs eləyib, irəlikindən artıq hökm verib. Çələbi şahın hüzurundan çıxıb, fərmanın alıb, Şəkiyə gəlir və (şah-red.) Məliki də çox söyüb, Şəkiyə göndərir. Şah gecə fikir eləyib, öz əmirlərinə buyurur ki, mənim hüzurumda bir kəsin həddi yoxdur ki, nəfəs çəkə. Şəkili Çələbi nə cürət sahibi varmış ki, boğazında kəndir cürət eləyib bu ərzləri mənə elədi. Heç sözün yanılmadı. Əlbəttə bundan bir xəta əmələ gələcək. Mənim zənnim xəta olmaz.

Bir neçə vaxtdan sonra məlik, Hacı Çələbidən yenə pis sözlər şaha ərz elər. Şah mühəssil göndərir ki, Hacı Çələbidən yüz tümən cərimə alın. Mühəssil gəlib Hacı Çələbidən pulu istər. (Çələbi – red.) Verməniəm, cürmüm nədir ki, cərimə verim, verməniəm (deyər). Bir neçə gün keçər. Sonra mühəssil deyər ki, pulu ver, yoxsa güclə döyərəm allam. Hacı Şeyxəli ki, Hacı Çələbinin əmisidir, deyər: "Çələbi, şahın nökəri ilə yüzləşmə, pulu ver". Hacı Çələbi verməz. Hacı Şeyxəli çox dövlətli imiş. Oğluna deyər ki, get evimdən pul gətir, cərimən verək. Hacı Çələbi deyər: sən də vermə. Hacı Şeyxəli onun sözünə baxmaz. Gətirər pulu

verər. Mühəssil cəriməni alır, gedir. Şaha burda keçən işləri ərz eylər ki, Hacı Çələbi pulu vermirdi, əmisi verdi. Onu da qoymurdu. Sözünə baxmadı verdi.

Bir neçə vaxtdan sonra Məlik Nəcəf, padşaha Hacı Çələbidən yenə təqsir ərz elər. Şah bu dəfə Hacı Çələbini istər ki, hüzura gəlsin. Adam gəlir Hacı Çələbiyə deyər. Hacı Çələbi bilir ki, bu dəfə yenə şah buna şübhə edəcək. Hacı Çələbi, hər nə ki, sünni əhlinin böyükləri və yüzbaşıları var, xəlvət yığıb, cəm eylər. Deyər ki, şah məni istəyibdir, amma bu dəfə getsəm bilirəm ki, gəlməyəcəyəm. Nə deyirsiz. Bular tamamən deyərlər ki, sən getsən biz Qızılbaşların qulluğuna tab və taqət gətirmənik. Səni getməyə qoymanıq. Deyər: bəs indi mən nə desəm elə elərsiz? Deyərlər: Elərik.

Sabahdan Hacı Çələbi sünni əhlinin böyüklərini və rəşidlərini götürüb gedib Məlik Nəcəfi bir para övladları ilə qırıb öldürürlər. Təmanən cəm olub, tarixi islamiyyə min yüz əlli altıda olanda Hacı Çələbini özlərinə hakim edib, Gələsən-görəsənə gedib, sığnaq elərlər.

Bu əhvəlatı padşaha ərz elərlər. Şah, qoşun göndərib, gəlib Daşbulaq kəndinin yanında Kotandüzü deyərlər, orada ordunu qoyub, bir para zübdə (seçmə) qoşun götürüb, Gələsən-görəsən tərəfinə gedər. Çox dava elərlər. Hər iki tərəfdən çox adam ölər. Hətta şahın qabağında pişxidmətin urarlar. Şahın ümərаları ərz elərlər ki, sənə fəda olaq bir para ac, bimənfəət adamlardan ötrü qoşunu nə hacət qırdırırsan. Sonra şah qəbul edib, qayıdıb ordusunda bir para vaxt dəgləşib (əyləşib) sonra gedib, o bir ildə genə gəldi.

Xülaseyi-kəlam üç il Hacı Çələbi Şəki əhli ilə Gələsən-görəsəndə oturub, çox aclıq və tənglik çəkibdirlər. Sonra şah çıxıb gedib. Bunlar da Noxuya düşübdürlər. Şah gedib, Xorasanda şahı öldürübdürlər. İranda məxşuşluluq çox olubdur. Hacı Çələbi çox böyük olub, Təbriz vilayətinəcən buna qulluq edibdirlər.

Nadir şah öləndən sonra İranda bir Əmir Aslan sərdar olub. O da Şəki vilayətinə qoşun çəkib gəlib. Hacı Çələbinin böyük oğlu Həsən ağa bir para qoşun ilə gedib, dava edibdirlər. Həsən ağa o davada ölüb. Əmir Aslan sərdar Şəki vilayətini ala bilməyib, qayıdıb gedibdir.

Bir neçə vaxtdan sonra xoylu Əhməd xan və qaradağlı Kazım xan (və qara) bağlı Pənah xan və gəncəli Şahverdi xan həsəd elərlər ki, Hacı Çələbi nəçün bir belə böyük olmaq gərək. Bular dördü Gürcüstan valisinə adam və kağız göndərərlər ki, biz və sən də qoşun götürüb gedib Hacı Çələbiyə tənbih eləyək. Vali çox qoşun yığıb gəlir. O, dörd xanlara adam göndərər. Olar da gəlir. Vali onların dördünü də dutub, öz qoşunu ilə Hacı Çələbinin üstünə gəlir. Xanları da öz yanında dustaq gətirir. Hacı Çələbi bunu eşidib, bu da qoşun götürüb gedib Şəmkir tərəfində vali ilə dava eləyib, vali çox pis basılıb, çox adamı ölüb, qayıdıb gedibdir. Hacı Çələbi o dörd xanları da valinin əlindən alıb, mürəxxəs eləyib[5], öz ölkələrinə gedibdirlər.

---

[5]. Azad edib.

Sonra bir kərə enə Gürcüstan qoşunu ilə vali gəlib Qanıq[6] kənarında Hacı Çələbi xan ilə dava edib, genə basılıb gedibdir.

Hacı Çələbi xan 12 il hakimlik edib, tarixi islamiyyə min yüz altmış səkkiz də olanda mərhum olub, ölübdür. Oğlu Ağakişi bəy də yerində hakim olub. Surxay xanın atası Məhəmməd xanın qızın alıb, beş il Şəkidə xanlıq edib. Sonra Ağakişi bəy qızını alan Məhəmməd xan, Qumux xanı qoşun ilə Ərəş mahalına gəlib, Ağakişi bəyə adam göndərər ki, qızımın əri gəlsin, görüşək. Ağakişi bəy də bir para adam götürüb gedər. Ərəş sultanı Məlik Əliməhəmməd xan ilə sözü bir olub. Məhəmməd xan tarixi islamiyyə min yüz yetmiş ikidə olanda Ağakişi bəyi öldürər. Qoşunun götürər. Noxuya gələr.

Hüseyn xan ki, Hacı Çələbinin böyük oğlu Həsən ağanın oğludur, o vaxt cahil oğlan imiş. Şəki bəylərinin bir parası onu götürüb Şirvan vilayətinə qaçıbdırlar. Məhəmməd xan Noxuya gəlib, Hacı Çələbinin çox pulun və xəzinəsinin yerini duyubdurlar. Yerdən çıxarıb, Noxuda zülmlər edib, qırx gün Noxuda qalıb. Qırx gündən sonra Şəki əhli dönüb, Hüseyn xanı Şirvandan gətirib, Məhəmməd xanı Şəkidən qovub, Hüseyn xanı Şəkidə xan edibdirlər. Ərəş sultanı Məlik Əli Hüseyn xana qulaq asmayıb. İki il Hüseyn (xan) xan olandan sonra İranda bir əfşar Fətəli xan varmış, sərdar imiş, Qarabağa gəlir. Məlik Əli Fətəli xan (ın) yanına gedər ki, Şəkidə onu xan eləyə. Hüseyn xan bunu eşidib, bu da peşkəş ilə sərdarın yanına gedər. Sərdar Fətəli xan bir para kəslərdən və böyüklərdən xəbər alır ki, Şəki vilayətinin əsl bəyzadəsi Məlik Əlidir, yoxsa Hüseyn xandır? Ərz elərlər ki, Hüseyn xandır. Onların övladı buların nökərləridir. Həmişə bunlara qulluq edibdirlər . Sonra sərdar Fətəli xan Məlik Əliyə naxoş olub[7] ki, ağanın yüzünə nəyçün durursan, deyib, tutub Hüseyn xana verib. Hüseyn xana xələt verib ki, mən də səni xan elədim. Hüseyn xan Məlik Əlini alıb, Şəkiyə gəlir və Məlik Əlini öldürür və Şəkidə hakim olur.

Hacı Çələbinin dörd oğlu var: Həsən ağa, Ağakişi bəy, Cəfər ağa və Hacı Əbdülqadir xan. Hüseyn xan (ın) xanlığından bir neçə il keçəndən sonra, bir para kəslər Cəfər ağaya təhrik verirlər ki, sən Hacı Çələbinin oğlusan Hüseyn xan nəvəsidir. Nəyçün sən xan olmursan, o xan ola. Cəfər ağa da bundan ötrü Hüseyn xandan ədavət elər ki, gün-gündən ədavət aralarında ziyad olur. Hüseyn xan nə qədər hərəkət edir ki, bunu islah eləyə çarə olmaz. Axırı iş çox bərki olur. Hüseyn xan çarə tapmaz. Cəfər ağanı ölürür. Və Hacı Əbdülqadir Cəfər ağanın qardaşıdır, bu işdən küdurət edib, bir neçə ildən sonra Şəki bəylərindən və Ərmiş (Ərəş) bəylərindən üstünə cəm edib,[8] qaçıb Ərəşdə, Kür kənarında Dardoqqaz adlı bir ada var, orada bir bərki səngər qayırıb, Qarabağlı İbrahim xan da, o da bulara kömək olub, orda durarlar. Hüseyn xan ilə onun arasında bir neçə davaları olub. Ağakişi

---

[6] .Qanıq-Alazan çayı
[7] .Acığı gəlib.
[8] .Başına yığıb.

bəyin oğlu Bala Hacı xan o davaların birində ölübdür. Hüseyn xan iyirmi il Şəki vilayətində xanlıq edib. Axırı bir neçə vaxtdan sonra Hacı Əbdülqadir bəy fürsət tapıb Şəki və Ərəş bəyləri ilə gedib, Hüseyn xanı Nuxa qalasında dutub, tarixi islamiyyə min yüz doxsan dörddə olanda Hüseyn xanı öldürüb, Şəki vilayətində xan olubdur. Hacı Əbdulqadir xan deyilibdir.

Bir neçə vaxtdan sonra Hüseyn xanın Əhməd ağa adlı bir oğlu varmış, onu da öldürür. Məhəmmədhəsən Hüseyn xan oğlu Qarabağda imiş. Ordan Cara gələr. Cardan qoşun götürüb gəlib Hacı Əbdülqadir xan ilə dava elər, basılır gedər. Hacı Əbdülqadir xan üç il yarım Şəkidə xanlıq edib.

Məhəmmədhəsən xan sonra bir də Cardan qoşun cəm edib, gəlib Hacı Əbdülqadir xan ilə dava edər. Bu dəfə Hacı Əbülqadir xan basılır.

Qacar, Şirvan vilayətində Mustafa xanın atası Ağası xanın yanına gedər. Ağası xan, onu tutub Məhəmmədhəsən xana verir. Tarixi islamiyyə min yüz doxsan səkkizdə olanda Məhəmmədhəsən xan onu öldürüb, Şəki vilayətində xan oldu və Məhəmmədhəsən xan Hacı Əbdülqadir xanın yeddi xırda oğlunu öldürübdür. Onun oğul övladı qalmadı.

Məhəmmədhəsən xan bir iki il xanlıq edəndən sonra, mənim atam Fətəli xan Məhəmmədhəsən xanın qardaşıdır, onun anası Ərəş sultanının qızıdır. Ərəş sultanı Məlik Əlinin oğlanları o vaxtda Ərəşdə böyük və sikkəli və güclü bəylərmiş ki, Fətəli xanın anasının qardaşlarıdır; Məhəmmədhəsən xan , Fətəli xanın qohumları böyük və çox olmaq və özü də Hüseyn xanın istəgi (istəkli) oğlu olmaq səbəbindən ehtiyat elər ki, bəlkə xarab eləyə[9], tutub Fətəli xanın gözlərin çıxarıb, özü də evində dustaq elər.

Bir neçə ildən sonra Səlim xan (Hüseyn xanın kiçik oğludur), Məhəmmədhəsən xan buna rütbə varməz, birütbə saxlar. Bəlkə xarab eləmək qəsdində olur. Səlim xan, Məhəmmədhəsən xanın yamanlıq qəsdindən qorxub bir para Şəki vilayətinin bəylərindən özünə yoldaş eləyib, tarixi islamiyyə min yüz doxsan doqquzda olanda Şəkidən qaçıb, Car vilayətinə gedər. Haman o ildə İran şahı Ağa Məhəmməd şah qoşun ilə Qarabağ vilayətinin üstünə gəlib, orada əyləşdi. Məhəmmədhəsən xan, şaha qulluq eləmək və ixlas[10] göstərməkdən ötrü Hacı Seyid adlı bir böyük, külli ixtiyar nökəri vardı, bunu padşahın qulluğuna göndərdi. Ağa Hacı Seyid ürəyində Məhəmmədhəsən xandan çox incik imiş. Və (o) şaha ərz elər ki, hərgah istəsən ki, Şəki vilayəti sənə qulluq eləyə, gərəkdir Məhəmmədhəsən xanı öldürəsən, ya gözlərin çıxardasan. Şah öz xanlarından ki, (Dəvəli) Mustafa xan ola, sərdar elər. On iki min qoşun verib, göndərər ki, get Şirvan vilayətin zəbt elə. Məhəmmədhəsən xanı dutub, gözlərini çıxardıb, Təbriz vilayətinə götür (ötür) getsin. Dəvəli Mustafa xan qoşun ilə Kürdən keçib, Şirvan

---

9 .Xəyanət edə.
10 .Səmimiyyət.

vilayətinə gəlir. Şirvan xanı Mustafa xan Fit dağı adlı bir bərk yer varmış, qaçıb orada sığnaq elər. Qızılbaş qoşunu Şirvanın çöllərindən ələ gələni çapar aparar.

Məhəmmədhəsən xan on iki il xanlıq eləyib. O ildə tarixi islamiyyə min iki yüz onda idi, Səlim xan Cardan və Avardan bir para qoşun cəm edib, gəlir. Göynük kəndinin yanında dava elədilər. Məhəmmədhəsən xan basılıb, gəlib Noxuya. Səlim xan Car və Avar qoşunu ilə daluncə Noxuya gəlib daxil olubdur. Dəvəli Mustafa xan qoşunu ilə Şirvandan Ağdaşa gəlib, bir neçə gün Ağdaşda qalıb, sonra Xaçmaz mahalında Tərkəş adlı kəndin ayağında düşüb əyləşdi.

Məhəmmədhəsən xan, Ağa Məhəmməd şaha qulluq elədiyinə və adamı şahın yanında olmağına (arxayın) olub, Dəvəli Mustafa xandan ötrü gəlir və nə fikirdə olmağından xəbəri olmayıb, gəlib Noxudan çıxar gedər ki, gedib Dəvəli Mustafa xandan qoşun alıb, Səlim xanı Şəkidən çıxarıb (çıxara). Tərkəş ayağında Dəvəli Mustafa xanın qoşununa daxil olan kimi, Mustafa xan Məhəmmədhəsən xanı tutdurub, tamam nökərlərin soydurub, özünün gözlərini çıxarıb, bir neçə qızılbaş adına (adamına) verib, Təbriz vilayətinə göndərdi.

Səlim xan Şəkidə xan olub əyləşdi. Bir neçə vaxtdan sonra Məhəmmədhəsən xanın yeddi xırda oğlun öldürübdür. Səlim xan da şaha qulluq eləmiyib, Qızılbaş qoşunundan ehtiyat edib, şəhəri köçürüb, Gələsən-görəsənə aparıb, orda sığnaq elədi. Ağa Məhəmməd şah o il Qarabağı ala bilməyib, qoşunların götürüb, geri qayıdıb getdi. Və Dəvəli Mustafa xan (ı) da Şirvanda öldürübdür. O bir ildə şah genə gəlib, qoşunu da Məhəmmədhəsən xanı da Muğanda qoyub, özü qalan qoşunu götürüb, Qarabağ üstünə gəldi.

Şirvanlı Mustafa xanı və Gəncəli Cavad xanı şah istəyib yanına aparmışdı. O il, çox aclıq olub, Qarabağ tab gətirməyib, İbrahim xan övladları ilə Car vilayətinə qaçdı. Şah Qarabağı alıb, özü gedib Şiş (Şuşa) qalasında əyləşdi. Haman o ildə ki, tarixi islamiyyə min iki yüz on birdə idi. Şişə qalasında şahın öz pişxidməti ki, bəlkə şah məni öldürə, bir gecə şahı öldürür. Sabahdan qoşun əhli bu qəziyyəni bilib, tamam qoşun bir-birinə dəyib, çox-çox məxşuşluq olub, Qızılbaş qoşunu tamam əkildi getdi. Və Şirvanlı Mustafa xan oradan gəlib, Muğandan Məhəmmədhəsən xanı da götürüb, Şirvana gəldi. Bir neçə gün saxlayıb, sonra Məhəmmədhəsən xanı götürüb, Şəkiyə gəldi ki, bunu yenə xan eləyə. Səlim xan eşidib, çıxıb qaçdı. Məhəmmədhəsən xanı Mustafa xan gətirib, bir də xan eylədi. Mustafa xan və Məhəmmədhəsən xan ikisi dost olub dolandılar. Səkkiz il Məhəmmədhəsən xan genə xanlıq elədi. Sonra xan ilə araları yaman olub düşmən oldular. Mustafa xan Səlim xanı Qarabağdan gətirdi ki, gələ Məhəmmədhəsən xanı çıxarıb Səlim xanı xan eyləyə. Və Məhəmmədhəsən xan da qoşun götürüb, Qarabağa gedəndə, yolda işin yüzünə baxıb bildi ki, ölkədə bunu istəməyən kəslər çoxdur. Mustafa xan ilə dava eləyə bilməz. Naçar qoşunu dağıdıb, bir para adamla Mustafa xanın yanına gedər ki, bəlkə genə mənim ilə dost ola, xanlıq munda qalıb, qayıda genə Şəkiyə gələ. Gedən kimi Mustafa xan bunu dutdurub Şirvana göndərir. Və Səlim xanı da saxlar. Bu fikirdə olar ki, öz bəylərindən birini Şəkiyə naib

göndərə. Şəki əhli böyük, kiçik yığılıb, mənim atam  Fətəli xanın üstünə cəm olub, andlar içib, bərk ittifaq edib, tarixi islamiyyə min iki yüz on doqquzda olanda xan edərlər. İki-üç ay xanlıq elər. Və Mustafa xan görər ki, elədiyi əmələ gətirə bilməz və Fətəli xanın yanına adam göndərər və dostluq elər ki, oğlun da göndərsin və bir neçə vaxt yanımda qalsın. Mən də kiçik idim. Atam məni Şirvana göndərdi. Mən gedən vaxt Səlim xanı Mustafa xan Ağdaş mahalına göndərdi. Ağdaşda bir neçə gün qalandan sonra Şəki bəylərindən iki-üç adam Səlim xana dil verər. Səlim xan da xəbərsiz bir gecə, atlanıb gələr. Fətəli xan xəbərsiz, and içibdirlər, nə bilsin ki, bir neçə bəy xəyanət elərmiş. Səlim xana dil verən bəyin birinə qalanın qapısını tapşırır. Qapıda duran bəy Səlim xan gələn kimi, qapını açıb  qalaya salır. Yuxarıda yazılan tarixdə Səlim xan genə Şəkidə xan olur. Bir il yarım xanlıq elər. Və (o) vaxt ki, Qarabağlı İbrahim xan dönüb, Rusiya qoşunu onun ilə dava eləyib, İbrahim xan öləndə Səlim xanın bacısı da orada ölür. Səlim xan bu işdən küdurət eləyib, yaxındakı Rusiya qoşunundan bir neçə adam öldürür. Səlim xanın bu xəyanətindən öz yanında olan sərdar valatəbar qəzəbnak olub. Nebolsin yanaral bir para Rusiya qoşunu ilə Səlim xanın üstünə göndərir. Səlim xan bir az dava eləyib, bacarmaz, çıxıb Qızılbaş tərəfinə qaçar.  Nebolsin yanaral bu vilayətin ixtiyarın genə Fətəli xana verir. Amma xoylu Cəfərqulu xan Şəki vilayətin padşahi-aləm pənahdan istəyib, padşah da ona veribdirmiş. Sonra tarixi islamiyyə min iki yüz iyirmi birdə olanda Cəfərqulu xan padşahın əmri ilə Şəki vilayətində xan oldu. Mən də Cəfərqulu xan əyyamı Şəkiyə gəldim. Təhrirən fi  20 (zil) qə'dətü-l-həram 1244  (24-Y-1829).

Hacı Çələbinin nəsli bu tərz ilə

| Hacı Çələbi xan |
|---|

| Həsən ağa | Ağakişi bəy |
|---|---|
| Hüseyn xan | Bala Hacı xan |
| | Mahmud ağa |

| Məhəmmədhəsən xan,  Fətəli xan,   Səlim xan |
|---|
| Kərim xan |

| | |
|---|---|
| Abdulla ağa,<br>Əbdülrəhim ağa,<br>Haşım ağa | Hüseyn ağa,<br>Hacı xan,<br>Səlim xan |

# HACI SEYİD ƏBDÜLHƏMİD
# ŞƏKİ XANLARI VƏ ONLARIN NƏSİLLƏRİ

Piran-i kühənsal [11] sələflərin rəvayət və ixbaratlarından mənqul [12] olunubdur ki, 848 sənəyi islamiyyədən müqəddəmdə [13] Şəki vilayətində müstəqillən hakim və xan olmayıb, ancaq kəndxuda və riş-i səfid [14] səlah və tədbirlərilə ümüratların [15] dolandırıblar. Haman tarixdə Candar Qara Keşiş oğlu müsəlman olub, adını Əlican qoyubdur. O vaxtlarda İran vilayətlərinin əmirlərinin əskərləri Şəkidə xan və hakim olmadığından şəbxun [16] gətirib, qarət və çox əsir aparırlarmış. Əlican çox aqil, kardan, şəci [17] şəxs imiş. Noxunun və Şəkinin camaatları ittifaq edib, İran qarətgərlərinin şərrlərindən əmin olmaqdan ötrü Əlicanı Noxuda hakimi-zümdə [18] edib, xan təyin edibdirlər ki, Şəki vilayətini mühafizə edib, ümuratlarını dolandırsın. Bu da əhsan surətdə dolandırıb. 861 (1456-57)-ci sənədə vəfat edib. Oğlu Qotul nam (adlı) onun məqamında [19] xan olub, vasitələrlə İran şahından xanlıq fərmanı da alıb, Şəki vilayətində xanlıq edibdir.... [20] sənədə vəfat edib, oğlu Zəki xan adlı xan olubdur. Bu da... sənədə vəfat edib, oğlu Həsən Sultan onun məqamında xan olubdur. Sonra Tiflis valisi Əlvənd xan [21] ilə Həsən Sultanın mabeynlərində [22] ədavət peyda olub, neçə illər Əlvənd xan qoşun gətirib, Həsən Sultan ilə cəngə gəlib, İran şahı Şah İsmayıl Həsən Sultana ianə edib, Əlvənd xan Həsən Sultana qalib ola bilməyib, müraciət edib. Şah İsmayılın vəfatından sonra Əlvənd xan külli qoşun götürüb, Həsən Sultan ilə cəngə gələn vaxtda Həsən Sultan da Şəki vilayətinin qoşunlarını cəm edib, Əlvənd xanın qarşısına gedib. Car vilayətindən Padar kəndinin pişgahında [23] cəngləri vaqe olub, Həsən Sultan məqtul olub [24], qoşunları da məğlub olubdur. Əlvənd xan da müraciət edib, Tiflisə gedibdir. Həsən Sultanın nəşin gətirib, Daşüzlə mövsüm yerdə dəfn edibdirlər. Oğlu Dərviş Məhəmməd xan atasının məqamında 914 (1508-09)-cü sənədə xan olub, İran şahı Şah Təhmasib Şah İsmayıl oğluna itaət etməyib,

---

11 .Qocaman.
12. Nəql.
13 .Qabaq.
14. Ağsaqqal.
15 .İşlərin.
16. Gecə basqını.
17 .Şücaətli.
18 .Seçilmiş.
19 .Yerində.
20 .Əlyazmasında burada və bir çox başqa yerlərdə tarix göstərilməmişdir.
21. Levond xan olmalıdır.
22 .Aralarında.
23 .Qabağında.
24. Öldürülüb.

təmərrüd [25] edibdir. Şah Təhmasib Dərviş Məhəmməd xanın bu hərəkatından qəzəbnak olub, İrandan qoşun gətirib, Dərviş Məhəmməd xana tənbih etməyə Şəkiyə gəlibdir. Dərviş Məhəmməd xan qaçıb miyani-kühdə[26] Gələsən-görəsən ilə mövsum (məşhur) olan vadidə təhəssün[27] edibdir. Noxu və Şəki adamlarının bəzisi Gələsən-görəsən və bəzisi Noxudan yuxarıda Kiş qalasına gedibdirlər. Şah Təhmasib hər gün o qalanın üstə qoşun göndərib, axirüləmr Kiş qalasını fəth etdirib, qalanı dağıtdırıbdır. Dərviş Məhəmməd xan bu haləti görüb, Gələsən-görəsəndən fərar edəndə şahın adamlarının əlində giriftar olub; başın kəsib, şah hüzuruna gətiriblər. Şəki xəlayiqi də istiman [28] edib. Şah əfv eləyib, buyruq veribdir, hər kəsə (kəs) gəlib, məqamında sakin olublar. Dərviş Məhəmməd xanın oğlu Bağı bəy də şah hüzuruna gəlib, şah öldürtməyibsə də, xanlıq hökümətini də Bağı bəyə verməyib.

Noxu adamlarından Hüseyncan adlı bir şəxsi müntəxib edib, məliklik fərmanı veribdir ki, Şəkinin umuratlarını dolandıra. Məlik Hüseyncan da... sənədə vəfat edib, oğlu Qayim yüzbaşı şahın əmrilə məliklik edibdir...sənədə Məlik Qayim vəfat edib, oğlu Məlik Əhməd adlı Noxuda məlik olub, Şəki vilayətinin hökümətin dolandırıbdır. Şahın fərmanı ilə məzkürüləsami [29] maliklər neçə il ki, məliklik ediblər. Şəki vilayətinin xərc və tövcilərin şaha verməyiblər. Şah o illərin daxodunu[30], məzkur Məlik Əhməddən istədibdir, verməyə qüdrəti olmayıb. Şah, Məlik Əhmədin ixtiyarın qət etdirib Noxu əşxaslarından Hüseynqulu adlını məlik təyin edib, fərman veribdir...sənədə Məlik Hüseyqulu vəfat edib. Əvvəlki məliklərin nəslində Əlimərdan adlı şah fərmanilə məlik olub, Şəki vilayətinin hökümətini dolandırıbdır...sənədə məlik Əlimərdan vəfat edib, onların nəslindən Məlik Nəcəf fərmanilə Noxuda məlik olub, rəiyyətlərə zülm və təəddilər [31] edibdir. Rəiyyətlər bunun zülmündən şaha şikayət ərizəsi göndəriblər. Şah əmrilə Noxu əşxasları fövqdə[32] məzkur Dərviş Məhəmməd xanın nəsli və nəsəbindən Çələbi adlını özlərinə vəkili-zübdə edib. Şah da Çələbiyə vəkillik fərman veribdir ki, Məlik Nəcəf üstə baxıcı ola. Məlik Nəcəf onun mərifətilə ümüratları dolandırıb, bir neçə müddət o hal üzrə güzəranları olub, axırda Məlik Nəcəf Çələbinin kəlamına guş verməyib,[33] xəlayiqə zülm və sitəmə şuru edibdir. Çələbi

[25]. Baş qaldırmaq, itaət etməmək.
[26] .Dağlar arasında.
[27] .Sığınaq.
[28]. Aman istəmək.
[29]. Adları çəkilən.
[30]. Mədaxilini.
[31] .Zülm, əzab.
[32]. Yuxarıda.
[33] .Qulaq asmayıb.

də xəlayiqi üstünə[34] cəm edib Məlik Nəcəfi qətlə yetiribdir. Bə´də[35] xəlayiq Çələbini xan nəsb edibdirlər.

Çələbi xanın nəsli belədir ki, Çələbi xan bini kəndxuda Qurban, bini Əlican, bini Əsgər bəy, bini Əlican bəy, bini Baqi bəy, bini Dərviş Məhəmməd xan. ...İran şahı Nadir şah Çələbi xanın o hərəkətlərin və əməllərin eşidib, qoşun götürüb, Hacı Çələbi xana tənbih əzmilə Şəki vilayətinə gəlibdir. Hacı Çələbi xan da Noxunun adamların götürüb Gələsən-görəsən dağının damənində Gavan ilə mövsüm yerdə nüzul edibdir. Hacı Çələbi xanın adamları gecələr gəlib, miyani-meşələrdən tüfəng atıb, şahın ordusuna xəsarət veribdirlər. Nadir şah oradan intiqal edib, Noxunu yandırıb, bir sahəti-vəsiədə mütəməkkin[36] olub bir neçə kərrə Gələsən-görəsənə qoşun göndərib, qalib ola bilməyib, müraciət edib, İran tərəfinə gedib, Muğan (adı) ilə məşhur yerdə nazil olub[37], sakin olubdur.

Hacı Çələbi xan da adamları ilə Gələsən-görəsəndən gəlib Noxuya. Nadir şah Muğandan qoşun göndəribdir ki, Noxunu qarət edib, Hacı Çələbi xanı dutub aparalar. Gəlib gecə Noxunun bir tərəfin qarət edib, Hacı Çələbini duta bilməyib, qayıdıb gediblər. Bədə Hacı Çələbi xan, oğlu Həsən ağanı şah hüzuruna göndəribdir ki, qarət mallarını və əsirlərini təvəqqe edə. Şah da tənə və sərzənişlə əmvali-mənhubələrini[38] verdirib və əsirlərini mürəxxəs edibdir. Bədə Nadir Şah Xorasana gedib, orada məqtul olub, İran sahibsiz qalıb, Hacı Çələbi xan da qoşun götürüb İrana-Təbrizədək gedibdir və qarət edib, qayıdıb gəlibdir.

İranda Əmir Aslan sərdar şahlıq ümuratların dolandıran olub, qoşun götürüb Şəki üstə gəlibdir ki, Hacı Çələbi xana tənbih edə. Hacı Çələbi xan oğlu Həsən ağanı qoşunla o sərdarın qabağına cəngə göndərib. Həsən ağa cəngdə məqtul olub, o sərdar qayıdıb İrana gedibdir.

Ondan bir müddət sonra Hacı Çələbi xan azarlayıb, vəfat edibdir, 1168 (1754-55)-ci sənədə. Sonra üç nəfər oğlu: Ağakişi xan[39], Hacı Əbdülqadir xan, Cəfər ağa. Və bir nəvəsi Hüseyn xan, davada məqtul olan Həsən ağanın oğlu qalıbdır.

Hacı Çələbi xandan sonra oğlu Ağakişi xan Noxuda xan olub, Qumuq xanı Məhəmməd xanın qızın alıbdır. Məhəmməd xanla Hacı Çələbi xanın arasında bir cuzi ədavət varmış. Məhəmməd xan, o müqəddəmədən[40] bir neçə il sonra Ərəş mahalına gəlib, Ağakişi xanı öz hüzuruna təklif edib və qətlə yetiribdir. Gəlib Noxunu zəbt edib və Hacı Çələbi xanın mədfunat pulların çıxardir. Bu halda Hacı

---

[34] .Başına.
[35] .Sonra.
[36] .Geniş bir sahədə yerləşib.
[37] .Düşüb.
[38] .Qarət olunmuş mallarını.
[39] .Bəzi sənədlərdə bu ad Ağakiş xan yazılmışdır.
[40] .Hadisədən.

Əbdülqadir xan həccə getmiş imiş və Cəfər ağa da mütəvari[41] olub gizlənib imiş və Hüseyn xan da Məhəmməd xanın sitəmindən fərar edib, Şamaxı xanı Ağası xandan istimdad[42] edibmiş. Ağası xanın Hüseyn xana qoşun verməyin Məhəmməd xan eşidib, Noxudan fərar edib, Qumuğa gedibdir. Hüseyn xan da gəlib əmisinin məsnədində[43] xan olubdur, 1184 (1770-71)-cü sənədə. Cəfər ağa da zavirədən çıxıb, xanlıq iddəasına düşübdür. Hüseyn xan Cəfər ağanı qətl etdiribdir. Hacı Əbdülqadir xan Məkkədən gəlib bu haləti görəndə üç nəfər bəylərlə Noxudan fərar edib, gedib Kür kənarında Dardoqqaz ilə mövsüm olan məqamda sakin olubdur. Ətraf və əknafdan[44] üstünə (başına) külli adam cəm olub, adını Hacı xan təsmiyə[45] ediblər. Hüseyn xan oğlu Məhəmmədhəsən xanı barışıq üçün əmisi Hacı xanın yanına göndəribdir. Bu da Məhəmmədhəsən xanı dutdurub Qarabağ xanı İbrahim xana göndərib ki, həlak etdirə. İbrahim xan Məhəmmədhəsən xanı məxfidə gizlədib, köynəyin qana bulayıb, Hacı xana göndəribdir ki, qətl etdirmişəm. Hacı xan neçə müddət orada qalıb, axırda noxulu Hacı Rəsul bəyi bir dəstə adamla gizlin Noxuya göndəribdir. Bəğtətən[46] Noxu qalasına daxil olub Hüseyn xanla cəng edib, Hüseyn xanı məcruh eləyib, qalanı zəbt edibdir. Hacı xana adam göndərib. Bu da gəlib Hüseyn xanı boğdurub öldürür, 1198 (1783-84)-ci sənədə, Noxuda xan olubdur. Bir müddət xanlıq edib. Məzkur İbrahim xan Məhəmmədhəsən xanı zühura çıxarıb Car vilayətinə göndərib. Car vilayətinin əşxasları qoşun götürüb, Məhəmmədhəsən xanı Noxuya gətiribdilər. Hacı xan fərar edib Şirvana gedibdir. Məhəmmədhəsən xan Noxuda xan olub, qoşun götürüb, Hacı xanı dutmağa Şirvana gedib və Hacı xanı dutub, qətlə yetirib, qayıdıb Noxuya gəlib, hökümətə məşğul olubdur.

...sənədə Məhəmmədhəsən xan Noxuda müstəqilən xan olandan sonra qardaşı Fətəli xanın gözlərin çıxartdırıb kor eləyibdir. Axır qardaşı Səlim xan Fətəliyə olan siyasəti görüb, mütəvəhhiş olub fərar edib. Müddəti-mütəmad[47] Carda qalıb, Cardan və Avardan qoşun cəm edib götürüb, Noxuda xan olmağa. Məhəmmədhəsən xanla cəngə gəlib, Göynük qəryəsinin[48] şərq cənubunda davaları vaqe olub. Məhəmmədhəsən xan məğlub olub, fərar edibdir. Bu halda da İran sərdarı Divəli (Dəvəli) Mustafa xan külli qoşunla Şəkiyə gəlib, Xaçmaz mahalında, Hacı Pir Əhməd cəmənilə mövsüm yerdə nüzül edib, mütəməkkin olubdur. Məhəmmədhəsən xan o sərdarın yanına istimdada gedibdir. O sərdar Məhəmmədhəsən xanı dutdurub, gözlərin çıxartdırıb, Qarabağa Ağa Məhəmməd

---

41 .Qaçaq.
42 .Kömək istəmək.
43 .Taxtında.
44 .Ucqar yerlərdən.
45 .Ad qoymaq.
46 .Qəflətən, gözlənilmədən.
47 .Uzun müddət.
48 .Kəndinin.

xan hüzuruna göndəribdir. O sərdarın özü də qayıdıb İrana gedibdir. Səlim xan 1210 (1795-96)-cu sənədə gəlib Noxuda xan olubdur. Ağa Məhəmməd şah haman sənədə Şişə qalasını fəth edə bilməyib, Məhəmmədhəsən xanı da götürüb İrana aparıbdır. Ağa Məhəmməd şah bir neçə müddət qalıb, Məhəmmədhəsən xanı da məhbus götürüb, Şişə qalası üstə külli qoşunla hərəkət edibdir. Qarabağda Ağa Məhəmməd şah qətl olunub, Məhəmmədhəsən xan bisahib qalıb. Şirvanlı Mustafa xan Məhəmmədhəsən xanı Şirvana aparıb, külli qoşunla Məhəmmədhəsən xanı gətirib, Noxuda xan nəsib edib gedibdir. Səlim xan da tab gətirməyib, qaçıb Qarabağa, qayınatası İbrahim xanın yanına gedibdir. Bir neçə il müddəti-mədid[49] Məhəmməshəsən xan Noxuda xanlıq edib, axırda Mustafa xan Şirvanilə Məhəmmədhəsən xanın aralarında ədavət peyda olub, Şirvanlı Mustafa xan, Məhəmmədhəsən xanın kinəsin [50] Qarabağdan Səlim xanı aparıb götürüb, Məhəmmədhəsən xanla cəngə gəlib. Məhəmmədhəsən xanın tab və tavanı olmayıb əczlə Şirvanlı Mustafa xanın yanına gediblər. Mustafa xan, Məhəmmədhəsən xanı və Səlim xanı götürüb Şirvana aparıb, Şirvan bəylərindən Şeyx Əli bəyi göndəribdir ki, gedib Noxuda naib olub, xanlıq ümuratların dolandıra. Noxu adamları Şeyx Əli bəyin gəlməyi müqəddəməsin eşidib o işə razı olmayıb. Məhəmmədhəsən xan (ın) qardaşı Fətəli xanın Noxuda xan olmağın eşidib, yoldan qayıdıb, Şamaxıya gedib, o əhvalatı Mustafa xana məlum edibdir. Mustafa xan Məhəmmədhəsən xanı Şamaxıda saxlayıb, qardaşı Səlim xanı mürəxxəs edibdir. Səlim xan da Ərəş mahalına gəlib ətraf və əknaf vilayətdən külli cəmiyyət üstünə (başına) cəm edib, gecə bəğtətən Noxu qalasına bilacəng[51] daxil olub, Fətəli xanı əzl edib, xan olubdur. Bir neçə müddət xanlıq edib və Rusiya dövlətinə Səlim xan tabe olub. Rusiya imperatoru ona xanlıq fərmanı veribdir. O da ixlasla itaət edirmiş. Bir neçə müddətin mürurundan sonra Rusiya qoşunu Qarabağlı İbrahim xanı Qarabağda qətlə yetiribdir. Səlim xan İbrahim xanın o vaqeəsindən mütəvəhhiş olub Rusiya dövlətindən rügərdan[52] olubdur.

---

[49] .Uzun müddət.
[50] .Acığına.
[51] .Döyüşsüz.
[52] .Üz çevirib.

Rusiya qoşunu Səlim xana tənbih etməyə gəlibdir. Səlim xan fərar edib, İrana gedibdir. Rusiya qoşunun generalı Noxunu zəbt edib, Fətəli xanı xan nəsb edibdir. O əsnada İran xanı Xoylu Cəfərqulu xan İran şahından rügərdan olub, Tiflisə gəlib, Rusiya imperatoru Noxunun xanlığın Cəfərquluya verdi. 7-8 il xanlıq edib, vəfat etdi. Oğlu İsmayıl xan Noxuda xan olub 3 ildən sonra vəfat etdi. Oğlu övladı qalmadı. Bundan sonra Noxuda komendant təyin olundu, xan olmadı. Səlim xanın övladları İrandadır. Bir oğlu Süleyman xan Qarabağda vəfat edib, övladları oradadır. Adları naməlumdur və bir qızı da Noxuda Mahmud ağada idi, Fəxrənnisə xanım adlı. Məhəmmədhəsən xan Hacı Tahirxanda (Həştərxanda) vəfat edibdir, 1246 (1830) il rəbiyələvvəl (avqust) ayında. Noxuda 3 nəfər oğlu: Abdulla ağa, Əbdürrəhim ağa və Haşım ağa namlar olub, Abdulla ağanın iki nəfər oğlu olub: Hüseyn, Cəfər ağa namlar və Haşım ağanın da iki nəfər oğlu olub: Sadıq ağa, Əbdülhəmid ağa namlar və 3 nəfər qız övladı olub. Əbdülhəmid ağanın bir qız övladı var imiş. O da Haşım ağa oğlu Əbdülhəmid ağanın övrəti olub. Fətəli xanın Kərim ağa[53] adlı bir oğlu var idi, vəfat edib. 4 nəfər oğlu və iki nəfər qızı qalıbdır: Əbdülhəmid ağa, Mustafa ağa[54], İsmayıl ağa, Cəfər ağa namlılar və Hacı xan, Hacı Əbdülqadir xan Hacı Çələbi xan oğlu qalmayıbdır. Bir nəfər qız Balaxanım xanım adında Yelisulu Daniyal bəydə idi. Onu tərk edib Ruma gedibdir və Hacı Çələbi xanın oğlu Ağakişi xanın oğlu Bala Hacı xandır. Bunun oğlu da Mahmud ağadır. Mahmud ağadan iki oğlan qalıb: Ağakişi bəy, Mirzə bəy adlı və iki nəfər də qız qalıbdır və Məhəmmədhəsən xanın qızı Tutu ağa, İsmayıl xanın övrəti idi. İsmayıl xandan bir qız var idi, İsgəndər xanda və bir qızı Səkinə xanım, o da Zaman bəydə, Məhəmmədhəsən xan rəiyyətzadə çox övrət alıb. Xeyrənnisa xanım Tutu ağanın anasıdır. Nuri xanım Abdulla ağanın anasıdır. Cəvahir xanım Əbdürrəhim ağanın anasıdır və Haşım ağanın anası çoxdan vəfat edibdir, adı bilinmədi. Fətəli xanın övrəti Xurşid xanım Kərim ağanın anasıdır və Səlim xanın övrəti Qarabağlı İbrahim xanın qızıdır. İranda vəfat edib adı məlum deyildir[55]

[53] Kərim ağa "Şəki xanlarının müxtəsər tarixi" əsərinin müəllifidir. Fateh təxəllüsü ilə şer yazarmış.

[54] S.Mümtazın yazdığına görə Kərim ağa Fatehin oğlu Mustafa ağa şair olub, təxəllüsü şuxi imiş (Hacı Seyid Əbdülhəmid. "Şəki xanlarının sülaləsi". Bakı, 1930, səh.9)

[55] Səlim xanın arvadının adı Tutu bəyimdir (Qafqaz arxeoqrafiya komissionunun aktları. III cild, səh, 333).

**ИЗ ИСТОРИИ ШЕКИНСКОГО ХАНСТВА**
/на азербайджанском языке/

**«ИЗДАТЕЛЬСКО-ПОЛИГРАФИЧЕСКОЕ ОБЬЕДИНЕНИЕ «АЗЕРБАЙДЖАНСКАЯ ЭНЦИКЛОПЕДИЯ»**

**БАКУ 1993**

**ИБ 77**

Yığılmağa verilmişdir 25.02.92. Çapa imzalanmışdır 6.08.93. Formatı 60x90 $^{1/}{}_{16}$ şərti çap vərəqi 1,3 Tirajı 10.000. Sifarişi 226. Müqavilə qiyməti. Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyi "Azərbaycan Ensiklopediyası" Nəşriyyat-Poliqrafiya Birliyi Bakı-370004. Böyük Qala küçəsi 41 "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur. Bakı. Aşıq Ələsgər küçəsi. 17.